**UOT: 338**

# SAHİBKARLIQ FƏALİYYƏTİN KOMPLEKS İNKİŞAFI VƏ FORMALAŞMASININ BƏZİ MƏSƏLƏLƏRİ

**N. İ. NAMAZOV**
**Azərbaycan Tibb Universiteti**

*Məqalə bazar münasibətləri şəraitində sahibkarlıq mühitinin formalaşması, təkmilləşdirilməsi inkişafına dair nəzəri təcrübi əhəmiyyətli kompleks nəticələrə gəlinmiş və müvafiq konkret təkliflər irəli sürülmüşdür.*

*Qeyd etməliyik ki, müasir dövrdə sahibkarlara kompleks yanaşılması yardımların, xüsusən sahibkarlığın mühitinə qayğı göstərməsi olduqca vacibdir. Məqalədə kiçik və orta sahibkarlığın inkişafı, biznes fəaliyyəti, vergi yükünün azaldılması, sahibkarlığın idarə edilməsi, hüquqi-iqtisadi bazarın formalaşması, sahibkarlara kömək fondlarının yaradılması öz əksini tapmışdır.*

***Açar sözlər:*** *sahibkarlığın inkişafı, kiçik və orta sahibkarlıq biznes fəaliyyəti, iqtisadi səmərəlik, kompleks inkişaf, sahibkarlara kömək* fondu.

Ölkəmizin bazar münasibətlərinə keçidinin ən mühüm istiqamətlərindən biri də sahibkarlı fəaliyyətinin davamlı inkişafının formalaşmasıdır. Yeni iqtisadi sistemə keçidlə əlaqədar olaraq, Azərbaycanda həyata keçirilən iqtisadi islahatların mərkəzi həlqəsi səmərəli sahibkarlıq mühitinin kompleksli inkişafının formalaşmasıdır.

Belə ki, Azərbaycan Respublikasının Konstitusiyasında bazar iqtisadiyyatı və onun əsas elementlərindən olan işgüzarlıq və rəqabət mexanizminin formalaşması, inkişafı, həmçinin onun qorunması ilə bağlı fundamental müddəalar öz əksini tapmışdır. 1997-ci ildən başlayaraq bir sıra baza qanunvericilik aktları (proqramları) ilə ölkəmizdə sahibkarlığın hüquqi bazasının formalaşmasında zəruri səviyyəyə nail olunmuş, təsərrüfat subyektlərinin dövlət qeydiyyatı prosesi xeyli təkmilləşdirilmişdir. Sahibkarlığın inkişafına maliyyə köməyinin göstərilməsi məqsədi ilə Nazirlər Kabineti tərəfindən Sahibkarlığa Kömək Fondunun fəaliyyətini təmin edərək zəruri mexanizmlər də yaradılmışdır. Fondun vəsaitinin formalaşdırılması mənbəyi əsasən dövlət büdcəsi olmuşdur. Belə ki, 2008-2015-ci illərdə fond tərəfindən kiçik sahibkarlığın öncül inkişafı istiqamətləri üzrə: yerli və gətirilmə xammaldan istifadə etməklə idxalı əvəz edən məhsulların istehsalı, yeni texnologiyaya əsaslanan ixrac qabiliyyəti məhsulların istehsalı, innovasiya yönümlü layihələr, qədim xalq sənətinin inkişafı sahələri üzrə layihələrə üstünlük verilmişdir. Bu müddət ərzində 900-dək sahibkarın investisiya layihəsi ekspertizadan keçirilmişdir. Belə ki, müsabiqə əsasında seçilmiş 30-a yaxın investisiya layihəsinə 3,8 milyard manatdan çox investisiya yardımı göstərilmişdir.

Respublikada kiçik və orta sahibkarlığın inkişafı sahəsində beynəlxalq və xarici ölkə təşkilatları ilə geniş əməkdaşlıq əlaqələri qurulmuşdur. Belə ki, BMT-nin İnkişaf Proqramı, Dünya Bankı, BVF, TASİS, BMT-nin Avropa İqtisadi Komissiyası, OECD, KTZ, EKO kimi təşkilatlarla geniş əməkdaşlıq həyata keçirilir. MDB, Balkan və Qara dəniz ölkələri ilə sahibkarlığın inkişafı sahəsində sabit əməkdaşlıq əlaqələri yaradılmışdır. Dünyanın inkişaf etmiş ölkələri – ABŞ, Türkiyə, AFR, Rusiya, Yaponiya, İsrail, İtaliya və Çin ilə ikitərəfli əlaqələr formalaşmaqdadır. Son illər kiçik sahibkarlığın inkişafına yardım sahəsində TASİS-in "Azərbaycanda kiçik və orta sahibkarlıq sektorunun inkişafı", UNDP-nin "Azərbaycanın kiçik və orta özəl müəssisələri inkişafına yardım", KTZ-nin "Azərbaycanda kiçik və orta müəssisələrə kömək" layihələri həyata keçirilir.

Kiçik və orta sahibkarlıq üçün təhsil, məsləhət və informasiya xidmətinin təşkili sahəsində həyata keçirilən tədbirlər də məqbul sayılmalıdır. Onların içərisində müasir tələblərə cavab verən işgüzar informasiya bankının yaradılması daha təqdirəlayiq haldır. Eyni zamanda yaradılmış strukturlar tərəfindən kiçik və orta bizneslə məşğul olan 1900 nəfərdən çox sahibkarların hazırlıq kursları və seminarlarda xüsusi hazırlıq keçmələri və qabaqcıl dünya təcrübəsinə yiyələnməkləri də kiçik biznesə kömək sahəsində ölkə miqyasında həyata keçirilən önəmli tədbirlər sırasındadır. Bu məqsədlə 250-dən çox iş adamı beynəlxalq təşkilatların proqramları çərçivəsində Avropa ölkələrində hazırlıq keçmiş və ixtisaslarını artırmışlar.

Kiçik və orta sahibkarlar üçün məsləhət xidmətinin təşkilində də dövlət tərəfindən fəal köməklik göstərilmişdir. Son illərdə xarici ekspert cəlb olunmaqla məsləhət xidməti ilə 2500 mindən çox kiçik və orta müəssisə əhatə olunmuşdur. 2008-2014-cü illərdə Kiçik və Orta Sahibkarlığın İnkişafı Agentliyi tərəfindən 1800-dən çox biznes-təklifi hazırlanmışdır. 1600-dən çox sahibkara əlavə məlumatların təminatı, işgüzar təkliflərin işlənməsi və yayılması, tərəf-müqabillərin axtarışı, danışıqların aparılması, reklam materiallarının hazırlanması və çap olunması xidmətləri göstərilmişdir.

Son illər kiçik və orta bizneslə məşğul olan sahibkarlar üçün vergi yükünün azaldılması istiqamətində də dövlət səviyyəsində müəyyən addımlar atılmışdır. Belə ki, mənfəət vergisi dərəcəsinin və məcburi sosial sığorta haqqının aşağı salınması istiqamətində konkret addımlar atılmış, kiçik biznes subyektlərinin bir qisminə vahid verginin tətbiqi, qanunvericilikdə təsbit olunmuş, əsas sənətkarlıq sahəsində hüquqi şəxs yaratmadan, sahibkarlıq fəaliyyəti göstərən şəxslərin gəlir vergisindən və həmin sənətkarların emalatxana binaları üçün əmlak vergisindən azad edilməsinə dair ölkə parlamenti tərəfindən çox önəmli qərarlar qəbul olunmuşdur.

Ölkə miqyasında kiçik biznesə kömək sahəsində yuxarıda qeyd edilən və diqqət mərkəzindən qaçırılmış təşkilati-hüquqi, beynəlxalq, sosial-iqtisadi tədbirlərin əhəmiyyətini azaltmadan qeyd etməliyik ki, hazırda kiçik sahibkarlıq sektorunun inkişafı sahəsində dövlətin fəaliyyəti, sahibkarların qarşılıqlı əməkdaşlığı, onların xarici-iqtisadi əlaqələri, bank-kredit və maliyyə məsələləri ilə bağlı bir sıra problemlər öz həllini gözləyir. Bu məqsədlə hazırlanan Sahibkarlığa Kömək Dövlət Proqramı özündə büdcədən maliyyələşmə, normativ-hüquqi, vergi güzəştləri və s. kimi məsələləri əhatə etməlidir. Ərazi və Sahə proqramları isə yerli xüsusiyyətləri nəzərə alan təşkilati-texniki təminat, təchizat, mövsümi yardım, kadr hazırlığı, yerli vəsaitdən maliyyə köməyi və sairəni özündə əks etdirməlidir.

Sahibkarlıq fəaliyyəti, xüsusilə də kiçik biznes – hüquqi-iqtisadi bazaya əsaslanan azad rəqabət şəraitində, maliyyəsiz, dövlət qayğısı hiss edən, işin son nəticəsi tam stimullaşan şəraitdə həyata keçirilməlidir. Eyni zamanda sahibkarlığın idarə edilmə prosesi təkcə ölkə səviyyəsindəki idarəetmə orqanları tərəfindən deyil, həm də müəssisənin yerləşdiyi ərazidə də məqsədli sistem yanaşması əsasında şərtləşməlidir. Belə ki, sahibkarlığın inkişafı prosesini təmin edən ərazi idarəetmə orqanlarının formalaşması vacibdir. Bu işdə Sahibkarlara Kömək Ərazi Proqramı bələdiyyələrin fəaliyyətinin əsasını təşkil etməlidir.

Sahibkarlara kömək üzrə müvafiq sahə proqramı isə əsasən lokal məsələlərin həlli üzrə istiqamətləri şərtləşdirməlidir. Təəssüflə qeyd etməliyik ki, hazırda respublikamızda sahibkarlara kömək üzrə Ərazi və Sahə proqramları tərtib edilməlidir.

Belə ki, respublikada sahibkarlığa kömək məqsədilə hazırlanan kompleks proqramının nümunəvi strukturunu aşağıdakı kimi təklif etmək olar:

Proqramın məqsədi və vəzifələri:

- ərazidə əhalinin sərbəst sahibkarlıq fəaliyyəti göstərməsinə real imkan yaratmaq üçün onların – istehsal, maddi-texniki təchizat, maliyyə, informasi və digər ehtiyatlardan istifadə edə bilmək imkanının yaradılması;
- regionun əhalisinin işgüzar aktivliyini təmin etmək məqsədilə sahibkarlıq fəaliyyəti üçün bazar infrastrukturlarının iqtisadi və hüquqi mühitinin formalaşdırılması;
- iqtisadiyyatın özəl bölməsini inkişaf etdirməklə bazarı əhalinin tələbatını ödəyən məhsullarla (xidmətlə) təmin etmək, regionda ayrı-ayrı sahələrin sürətli inkişafına şərait yaratmaq və kütləvi işsizliyi aradan qaldırmaq;
- ərazidə əhalinin həyat səviyyəsinin yüksəldilməsini təmin etmək və sahibkarlıq fəaliyyəti haqqında müsbət ictimai rəyin formalaşması və s.;

Sahibkarlıq fəaliyyətinin inkişafının prnsipləri və metodları isə bunlardan ibarətdir:

- sahibkarlığın inkişafı üzrə dövlət və ərazi idarəetmə orqanlarının aktiv cəlb olunması ilə işgüzar insanların hüquq və vəzifələrini nəhdudlaşdırmağa imkan verməmək
- mülkiyyət formasından asılı olmayaraq, bütün təsərrüfat subyektlərinə mövcud qanunvericilik əsasında azad və bərabər iş şəraiti yaratmaq;
- proqramlara məqsədli yanaşılması əsasında ictimai problemlərin həllini ərazinin (şəhərin, rayonun) sosial-demoqrafik və təbii coğrafi xüsusiyyətlərinə uyğun kiçik biznesin inkişaf etdirilməsi;
- müxtəlif bazar infrastrukturlarının inkişafını balanslaşdırmaq;
- sahibkarlığa kömək və onun inkişafı üzrə görülmüş işlər haqqında əhali kütləsinə geniş məlumat vermək, onlara məsləhət xidməti göstərmək;
- sahibkarlıq fəaliyyətinin inkişaf problemləri üzrə ərazi (yerli) normativ aktlarının, metodiki vəsaitlərin və təkliflərin hazırlanması.
- sahibkarlıq fəaliyyəti üçün aktual sayılan problemlərin həlli üçün maraqlı təklifləri də cəlb etməklə ərazi (rayon, şəhər) üzrə sahibkarların yığıncaqlarını, konfranslarını, konqreslərini, dəyirmi masalarını v. s. keçirmək.

Qeyd etmək lazımdır ki, proqramın həyata keçirilməsinin hər mərhələsi öncül istiqamətləri, vaxt amili baxımından özündə əks etdirməlidir.

Proqramda prioritet istiqamət olaraq ərzaq məhsullarının istehsalı və emalı, sənaye məhsullarının, xalq istehlakı mallarının, dərman preparatlarının, tibbi-texniki ləvazimatların istehsalı, əhaliyə məişət və kommunal xidmətləri göstərmək, istehsal mənzil və sosial təyinatlı obyektlərin tikilməsi, əhaliyə satmaq üçün tikinti materiallarının istehsalı, innovasiya fəaliyyəti, sahibkarlıq fəaliyyəti üçün kadr hazırlığı və onların ixtisasının artırılması, sahibkarlıq fəaliyyətinin inkişafını təmin edən investisiya komplekslərinin genişləndirilməsi, ekoloji təhlükəsizlik, fond bazarının inkişafı və s. nəzərdə tutulur.

Proqramın maliyyə-kredit və maddi-texniki təchizat təminatı məsələsi olduqca vacib məsələdir. Bu məsələlərin həll edilməsi, proramın həyata keçirilməsi, sahibkarlığa kömək və rəqabət şəraitində inkişafını təmin etmək üçün aşağıdakı mənbələrdən formalaşan sosial-iqtisadi inkişaf fondunun maliyyə ehtiyatlarından, ərazi (rayon, şəhər) büdcəsinin vəsaitindən, bələdiyyələrin vəsaitlərindən, sahibkarlığın inkişafı məqsədilə respublika büdcəsindən ayrılan vəsaitdən istifadə

edilməlidir. Qeyd etmək lazımdır ki, yerli büdcələrə köçürülmüş vəsait məbləğində istehsal təyinatlı sahibkarlıq fəaliyyəti göstərən müəssisələrə differensial məqsədli vergi güzəştləri də tətbiq edilməlidir. Bundan başqa sahibkarlara kömək və onun inkişafı üçün kommersiya banklarının sosial-iqtisadi inkişaf fondu üzrə zəmanət krediti, investisiya təyinatlı vergi kreditlərindən də istifadə edilməlidir.

- Sahibkarlıq fəaliyyətinin inkişafının mərhələləri və formalarına gəldikdə isə ərazinin 2015-2018-ci illər üzrə sosial-iqtisadi inkişafının konsepsiyası əsasında sahibkarlıq fəaliyyətinin normal inkişafını təmin edən kompleks tədbirlər işlənib hazırlanmalıdır.

Respublika üzrə qəbul edilmiş proqram çərçivəsində (2008-2015) sahibkarlığa kömək və onun inkişafı üzrə uzunmüddətli strategiyanın formalaşdırılması təmin edilməlidir. Sahibkarlıq fəaliyyətinin inkişafında yeni tipli bazar infrastrukturlarından (səhmdar cəmiyyəti, inkubatorlar, sahibkarlığa kömək mərkəzləri, texniki parklar, maliyyə-kredit təminatı proqramları və s.) geniş istifadə edilməlidir. Bu işdə isə dövlət idarəetmə orqanları ilə ərazi (bələdiyyə) orqanları arasında koordinasiya əlaqələrinin genişləndirilməsinə xüsusi diqqət yetirilməlidir.

Bazar iqtisadiyyatına keçid şəraitində mühüm məsələlərdən biri proqramların normativ-hüquqi təminatı və sahibkarlığın inkişafı üçün təşkilati tədbirlərin işlənib hazırlanması və həyata keçirilməsi məsələsidir.

Sahibkarlığa kömək və onun inkişafı üzrə “Sahə proqramı” öz məzmunu və quruluşu ilə “Ərazi proqramı”ndan köklü surətlə fərqlənir. Lakin həmin proqramların əhatə etdiyi subyektlər eyni coğrafi ərazidə bir-birini tamamlayır, daha doğrusu, sahə proqramı ərazi proqramının müəyyən hallarda tərkib hissəsinə çevrilirlər.

Qeyd etmək lazımdır ki, proqramda nəzərdə tutulan tədbirlərin həyata keçirilməsi maliyyə mənbələrindən, sahənin mərkəzləşdirilmiş maliyyə vəsaitindən, bank kreditindən, mənfəətdən ayırmalar və digər fəaliyyətdən əldə edilən gəlirdən, xarici investisiya və müvafiq inkişaf banklarının proqramlarının vəsaitindən və yerli icra orqanlarının məqsədli vəsaitindən ibarətdir.

Nəhayət, sahibkarlığa dövlət köməyi sahəsindəki siyasət kompleks və koordinasiya xarakteri daşımalıdır. Yerli icra orqanları və bələdiyyələr, İqtisadi İnkişaf Nazirliyi arasında sahibkarlığın inkişafına dair koordinasiya və dövlət maraqları təmin edilməlidir.

## ƏDƏBIYYAT

**1.** Azərbaycan Respublikası Konstitusiyası. Bakı, 12 noyabr 1995. **2**. Əliyev A., Şəkərəliyev A. Bazar iqtisadiyyatına keçid: dövlətin iqtisadi siyasəti. Bakı, 2002. 440 s. **3.** “2008-2015-ci illərdə Azərbaycan Respublikasında əhalinin ərzaq məhsulları ilə etibarlı təminatına dair” Dövlət Proqramı. Bakı, 25 avqust 2009-cu il. **4.** Azərbaycan 2020: gələcəyə baxışı inkişaf konsepsiyası. Bakı, 29 dekabr 2012-ci il. **5**. İqtisadi nəzəriyyə. Dərslik. Bakı, 2014.

## Некоторые вопросы устойчивого, комплексного развития предпринимательской деятельности

**Н.И.Намазов**

В статье даны соответствующие конкретные предложения и показано знание теоретических комплексных результатов формирования, совершенствования и развития предпринимательской среды в условиях рыночных отношений.

Надо отметить, что в современный период необходимо оказывать комплексное внимание и помощь предпринимателям, в особенности необходимо оказывать внимание предпринимательской среде.

В статье нашло свое отражение, развитие малого и среднего предпринимательства, бизнес-деятельность, снижение налоговой нагрузки, управление предпринимательства, формирование юридическо экономического рынка, создание фондов помощи предпринимателям.

***Ключевые слова:*** развитие предпринимательства, среднее и малое предпринимательство, бизнес-деятельность, экономическая эффективность, комплексное развитие, Фонд помощи предпринимателям, национальное предпринимательство

## Some problems of complex development of ownership activity

**N. İ. Namazov**

Complex results with theretical practical importance about formation of ownership sorrespinding to sonsrete offers in the market relations sondition were given in the srticle.

It must be noted that complex approach to owners, specially to show care to ownership in the modern period are very important.

Development of small and middle ownership, busines activity, decrease of tax-paying load, sontroling of ownership, formation of legal economic market, sreation of help funds to owners are reflected in the article.

***Key words:*** development of ownership, little and middle ownership business activity, economic rationality, complex development, relief fund to owners, national ownership**.**